Azərbaycan Aqrar Elmi 4 2018 Аграрная Наука Азербайджана

UOT 632.952

# ABŞERON ŞƏRAİTİNDƏ BECƏRİLƏN NAR BİTKİSİ XƏSTƏLİKLƏRİNİN NÖV TƏRKİBİ, NARIN MORFOLOJİ XÜSUSİYYƏTLƏRİ, ƏSAS SORTLARI VƏ XƏSTƏLİKLƏRİN RASTLAŞMA TEZLİYİ

**O.T.MƏMMƏDOV, Z.M.MƏMMƏDOV, Ş.H.ALLAHVERDİYEV**
**AKTN BM və TBETİ Abşeron Təcrübə Stansiyası**

*Məqalədə Abşeron yarımadasında nar bitkisinin xəstəliklərinin növ tərkibi, başlıca xəstəliklərin yayılması, narın morfoloji əlamətləri, geniş yayılmış və itmək təhlükəsi ilə üzləşmiş sortlar haqqında məlumat verilmişdir.*

***Açar sözlər:*** *morfoloji əlamətlər, sortlar, xəstəliklərin növ tərkibi, əsas xəstəliklərin yayılması, müşahidə tezliyi.*

Müstəqillik yolunda inamla irəliləyən Azərbaycan Respublikası əhalisinin hazırkı dövrdə və gələcəkdə kənd təsərrüfatı məhsullarına olan tələbatını tam şəkildə ödəmək üçün məhsuldarlığı aşağı olan bitki, sort və hibridlərin keyfiyyəti yüksək olan, xəstəliyə, quraqlığa, şaxtaya və s. davamlı bitki sortları ilə əvəz olunması böyük əhəmiyyət kəsb edir.

Müasir bitkiçilik sisteminin ən öncül sahələrindən biri kənd təsərrüfatı bitkilərinin zərərverici və xəstəliklərdən mühafizəsidir. Müxtəlif mənbələrin verdiyi məlumata görə, hər il dünyada istehsal olunan məhsulun 30-32%-i zərər vuran orqanizmlər tərəfindən, 10-12% hazır məhsul isə saxlanma yerlərində məhv olur. Ayrı-ayrı xəstəliklər üzrə bu itkilər daha yüksək olur.

Hazırda bazar iqtisadiyyatı dövründə əksər kənd təsərrüfatı müəssisələri, şəxsi təsərrüfatlar və əhali bu problemlə daima rastlaşaraq, çoxlu sayda məhsul itkisi ilə üzləşirlər. Məhz bu itkilərin qarşısını almaq üçün fermerlərə və əhaliyə kömək məqsədi ilə xəstəlik və zərərvericilərə qarşı dözümlü sortların yaradılması, kompleks mübarizə tədbirlər, məhsulun qorunması, məhsuldarlığın artırılması yollarının təkmilləşdirilməsi və s. bu kimi inteqrir mübarizə tədbirləri hazırlanır və tövsiyə edilir. Bu istiqamətdə sərfəli, iqtisadi cəhətdən səmərəli mübarizə tədbirlərinin təkmilləşdirilməsi və tətbiqi vacib şərtlərdən biridir.

Nar Respublikamızda əkilən subtropik bitkilərin başlıca növlərindən sayılır. Son dövrdə nar bitkisi barədə çox az elmi tədqiqat işləri aparılmış, yeni elmi ədəbiyyatlar çap olunmamışdur. Mövcud köhnə mənbələr müasir dövrü əks etdirmir. Bu qiymətli bitkininin hətta bəzi növləri tamamilə sıradan çıxmaq təhlükəsi ilə üzləşmişdir. Ona görə müxtəlif mənbələrdən əldə olunmuş materiallar əsasında və tərəfimizdən aparılmış kiçik həcmli tədqiqatların nəticələrini nəzərə alıb, nar bitkisi haqda bu məqalənin yazılmasını lazım bildik.

Nar *Punicaceae* fəsiləsinə, *Punica* cinsinə, qranatium növünə aid olan kol bitkisidir. Bu bitkinin meyvələri ən çox çərəz kimi yayılır, habelə natural şirə, nar şərab və digər qidaların hazırlanması üçün istifadə olunur. Meyvələrin tərkibi C vitamini 20-25%, şəkər 14,5-21%, 0,2-4,5%-ə qədər turşu olur. Nar meyvəsinin qabığında 28-29% tanin maddəsi vardır ki, bundan da gönlərin aşılanmasında istifadə olunur. Nar qabığından yaraların sağaldılması və qarın nahiyəsində olan qurdların tökülməsində, çiçəklərindən parça boyamaq üçün boya və mürəkkəb hazırlanmasında istifadə olunur. Kolları dekorativ bağçılıqda bəzək məqsədi ilə də becərilir.

Nar 2-4 m hündürlükdə çoxgövdəli olmaqla budaqlarında kiçik tikanlar vardır. Çiçəklərin kasa yarpaqları ətli, çiçək yatağı, kasacıq və ləçəkləri qırmızı rəngdə olur. Meyvəsi yalançı giləmeyvədir. Sortlardan asılı olmayaraq meyvələr adətən dairəvi formada olmaqla, çiçəyi isə üç tipdə: uzun, qısa və orta sütuncuqlu olur. Bunlardan əsasən uzunsütuncuqlu çiçəklər meyvə verir. Digər çiçəklərdə isə rüşeym kisəciyi inkişaf etmədiyindən meyvə vermir və tökülür. Bitkiyə pis qulluq edildikdə əmələ gələn çiçəklərin çoxu qısa və ya orta sütuncuqlu çiçəklər olur ki, buda məhsuldarlığa ciddi təsir göstərir.

Nar kolu bölgədə adətən may ayının əvvəlində çiçəkləyir, bu proses iyulun son günlərinə, hətta avqustun əvəllərinə qədər davam edir. Bitkinin vegetasiya dövrü sortlardan asılı olaraq 170-220 gün, meyvələrin inkişaf dövrü 120-170 gün davam edir. Nar bitkisi 40 ilə qədər meyvə verə bilir, istilik sevən bitkidir, -18-20$^0$C-də yerüstü hissələr quruyur.Yetişkənlik sentyabr, oktyabr aylarına təsadüf edir.

Nar Meyvəsi dadına görə 5 növə ayrılır:

1. Şirin nar: Turşuluq hiss olunmur;
2. Turşaşirin nar: Şirinlik çox, turşuluq az hiss olunur;

3. Meyxoş nar: Şirinlik və turşuluq eyni bərabərdə hiss olunur;

4. Turşməzə nar: Turşuluq çox, şirinlik az hiss olunur;

5. Turş nar: Şirinlik hiss olunmur.

Abşeron bölgəsində şəxsi təsərrüfatlarda, idarə və elmi-tədqiqat müəssisələrində, park və yol kənarlarında narın Azərbaycan gülövşəsi, Bala Mürsəl, Nazik qabıq, Vələs, Vir-1, Göy şirin nar, Turş nar, və s. sortları pərakəndə qaydada əkilib becərilir.

**1. Bala Mürsəl**-Kolun boyu 3 m-ə qədər olur, meyvələri tünd qırmızı, dənələri orta irilikdə tünd qırmızı rəngdə nazik uzunsov formasındadır. 46-51% şirə çıxımı verir, məhsuldarlığı hər koldan 30-50 kq-dır.

**2. Azərbaycan gülövşəsi**-Meyvənin rəngi nisbətən açıq-qırmızıdır. Ağacların boyu 3-3,5 m-ə qədər olur. Meyvələrdən şirə çıxımı 50-55%, məhsuldarlıq hər kolda 35-45 kq-dır. Respublikanın bir çox bölgələrində əkilib becərilir.

**3. Nazik qabıq**-Göyçay, Ağsu, Ağdaş, Xaldan rayonlarında xeyli yayılmışdır. Rəngi nisbətən açıq-qırmızıdır. Dadına görə 4-cü qrupa aid olunur. Morfoloji əlamətlərinə görə Bala Mürsəl sortuna oxşayır. Şirə çıxımı 45-48% təşkil edir. Hər koldan orta hesabla 40-45 kq məhsul əldə etmək mümkündür.

**4. Qırmızı qabıq**-Boyu 3 m-ə qədər olur, az tikanlıdır, meyvələri iri, düzgün formalı, qabığı açıq qırmızı rəngdə, orta qalınlıqda və parlaqdır. Meyvəsi dadına görə 4-cü qrupa aiddir. Şirə çıxımı 45%, hər koldan 45 kq-a yaxın məhsul verə bilir.

**5. Şüvəlan narı**-Meyvələrin çəkisi 200-250 qr, rəngi tünd qırmızı, dadına görə 2-ci qrupa aiddir. Tərkibində 14%-ə qədər şəkər, 2%-ə qədər turşuluq olur. Şirə çıxımı 40-43%, məhsuldarlıq hər koldan 40 kq-dır. Gec yetişən sortdur.

**6. Şirin nar**-Ən çox Azəribaycanda təsadüf olunan sortdur. Dadına görə 1-ci qrupa aid olunur. Bir neçə növü mövcuddur: ağ şirin, göy şirin. Meyvənin tərkibində şəkər 15%, turşuluq 0,58%, şirə çıxımı 50%, məhsuldarlıq 40 kq-a qədər olur. Yetişmə oktyabrın əvvəlindən başlayır.

Apardığımız müşahidələrlə müəyyən edilmişdir ki, narın bir sıra sortları itmək təhlükəsi qarşısındadır. Bunlar-Qaragilə, Şahnaz, Şüvəlan və s. sortları qeyd edə bilərik.

Nar meyvəsinin yüksək keyfiyyətdə olması üçün yetişmə zamanı (sentyabr, oktyabr) yağmursuz və ya az yağmurlu olmalıdır. Çox su tələb etməsə də, illik yağıntının miqdarı 800 mm-dən az olduqda hər vegetasiyanın əvvəlində suvarma aparılması zəruridir. Orta gilli, qidalı torpaqlarda yaxşı inkişaf edir.

Abşeron iqtisadi bölgəsi şəraitində aparılmış çöl müşahidələri zamanı bölgədə nar kollarına ziyan vuran 6 növ infeksion, bir növ qeyri-infeksion xəstəlik qeydə alınmışdır. Aşağıdakı cədvəldə müşahidə olunan xəstəliklər barədə ətraflı məlumat verilmişdir.

Cədvəl 1.

| | № | Xəstəliyin adı | Aid olduğu sinif | Törədicinin adı | Xəstəliyin bölgədə rastlaşma tezliyi |
|---|---|---|---|---|---|
| İnfeksion | 1 | Qonur ləkə | Bazidimisetlər Bazidiomeycete s | Marssonian a juqlandis | + |
| | 2 | Fomopsis və ya gövdə Xərçəngi | Coelomyketlər Coelomyketes | Phamo punikal Tassi | + |
| | 3 | Monilioz | Ascomüsetlər | Monilinia SP | + |
| | 4 | Dəmgil | Ascomycetes | Sphaceloma punikae Bitane | + + + |
| | 5 | Meyvə çürüməsi | İkicinslilər Maqnolofsida | Zythia versoniana Sacc | + + + |
| | 6 | Alternaria | | Alternaria Sp | + |
| qeyri-iinfeksion | 7 | Nar qabığını partlaması | | | + + + |

Cədvədən göründüyü kimi, Abşeron bölgəsi şəraitində nar kollarına Dəmgil, Meyvə çürüməsi və qeyri-infeksion xəstəlik sayılan Qabıq partlaması hər il böyük iqtisadi ziyan vurur. Apardığımız müşahidələr zamanı 2017-ci ildə bölgə üzrə bəzi məntəqələrdə başlıca infeksion xəstəliklərin yayılması və intensivliyi təqdim olunur.

**Cədvəl 2.**

**Abşeron şəraitində narda Dəmgil və Meyvə çürüməsi xəstəliklərinin yayılması 2017**

| № | Məntəqələr | Xəstəliklər | | | |
|---|---|---|---|---|---|
| | | Dəmgil | | Meyvə çürüməsi | |
| | | Yayılma % | İntensivlik % | Yayılma % | İntensivlik % |
| 1 | Maştağa ərazisi | 34 | 22 | 36 | 23 |
| 2 | Binə ərazisi | 40 | 25,5 | 38 | 24 |
| 3 | Bayıl-Qobustan ərazisi | 46 | 29,5 | 34 | 20,5 |
| 4 | Xırdalan ərazisi | 40 | 23,5 | 40 | 21,5 |
| 5 | Bölgə üzrə orta hesabla | 40 | 25,1 | 37 | 22,2 |

Cədvədən göründüyü kimi, hər iki xəstəlik narın məhsuldarlığına güclü təsir edir və xeyli miqdarda məhsul itkisi yaradır. Respublika üzrə nar əkinləri ilə məşğul olan şəxslərə və təsərrüfatlara aşağıdakı tədbirləri ən azı əməl etməyi tövsiyə edirik.

Nar bağlarında ziyanlı orqanizmlərə qarşı müasir tələblərə cavab verən inteqrir mübrizə metodlarına mexaniki, aqrotexniki, bioloji və kimyəvi tədbirlər daxil edilmişdir. İnteqrir mübarizənin əsasını təşkil edən bu tədbirlərə aşağıdakılar daxildir: nar əkinləri üçün sahənin düzgün seçilməsi, xəstəlik və zərərvericilərə qarşı davamlı sortların seçilib əkilməsi, kompleks aqrotexniki tədbirlərin tətbiqi, torpağın aqrotexniki vəziyyətinin yaxşılaşdırılması, vaxtında yemləmə, suvarma, budama və forma verilməsi, alaq otlarının məhv edilməsi, məhsulun vaxtında yığılması və s. bütün bunlar birlikdə nar bağlarında xəstəlik və zərərvericilərə qarşı effektiv mübarizəni təmin edir.

Kimyəvi mübarizə tədbirlərindən ən zəruri halda istifadə olunmalı, bioloji mübarizə metodlarına geniş yer verilməlidir. Kimyəvi pestisidlərdən ancaq o halda istifadə olunmalıdır ki, zərərli orqanizmlərin miqdarı iqtisadi ziyanı həddə (İZH) çatsın və böyük itki gözlənilsin. Bu tədbirlərin optimal dövrünü və preparatın optimal dozası hökmən nəzərə alınmalıdır.

## ƏDƏBİYYAT

1. Axundzadə i.m. Subtopik bitkilər. Bakı, 1945, s. 11-42. 2. Cəfərova i. Ümumi fitopatologiya. Bakı, 2009, s. 13-77. 3.Nəbiyeva z. Azərbaycanın subtropik bitkiləri. Bakı, 1966, s. 4-15. 4. Агаева а.и. Изучение заболеваний граната в условиях азербайджана и разработка мероприятий по борьбе с главнейшими из них. Автореферат диссертации. 1971, 21 с. 5.Məmmədov o.t. Bakı, 2013, hesabat 5. S. 5-13

## Основной состав болезней граната выращенных в апшеронском полуострове, морфологические признаки граната, его основные сорта и чистота наблюдаемых болезней

**О.Т.Мамедов, З.М.Мамедов, Ш.Г.Аллахвердиев**

В статье представлено информация, об, основных болезней граната, об их распространение, а, так же морфологические признаки и основные сорта граната выращенных в условиях апшеронского полуострова.

**Ключевые слова:** морфологические признаки, разновидность, болезни, видовой состав, чистота наблюдения, распространение основных болезней

## Type of composition of pomegranate diseases, cultivated in absheron conditions, morphological characteristics, basic varieties and frequency of disease

**O.T.Mammadov, Z.M.Mammadov, Sh.H.Allahverdiyev**

In the article has been informed about the composition of the pomegranate plant diseases, the spread of major diseases, morphological symptoms, and varieties that are exposed to the danger of widespread and disappearance on the absheron peninsula.

***Key words**: morphological indications, varieties, diseases, species composition, the frequency of observation.*